## MÜNDƏRİCAT

**İslam Həqiqətləri Mərkəzindən**

Rəhman və Rəhim Allahın adı ilə

... Sonuncu və ən kamil din, peyğəmbərlərin sonuncusu Həzrət Məhəmməd Müstəfanın (Allahın salavatı ona və ailəsinə olsun) peyğəmbərliyə seçilməsi ilə insanlara təqdim olundu. İlahi peyğəmbərlərin din və risaləti o həzrətin nübüvvəti ilə sona çatdı.

İslam dini Məkkə şəhərində çiçək açdı. 23 il ərzində Allah Rəsulunun (s) və vəfalı səhabələrinin bir dəstəsinin sonsuz səyi nəticəsində bütün Ərəbistan yarımadasını bürüdü.

Bu İlahi yolun davamı zil-hiccə ayının 18-i, Qədir Xumda və aydın şəkildə, Allah-taala tərəfindən Peyğəmbərdən (s) sonra, İslam dünyasının ən ali məqamlı şəxsi olan İmam Əli Əmirəl-mömininə (ə) tapşırıldı.

Bu gün, Həzrət Əlinin (ə) vilayət və canişinliyi elan olunmaqla, İlahi nemət tamamlandı, İslam dini kamilləşdi və sonra Allahın bəyəndiyi yeganə din olaraq elan edildi. Beləcə kafirlər və müşriklər İslam dinini məhv etməkdən məyus oldular.

Çox çəkmədi ki, Peyğəmbərin (s) tərəfdarlarından bəzisi, öncədən hazırlanmış hiylə ilə Peyğəmbərin (s) vəfatından sonra hidayət və rəhbərlik yolunu azdırdılar. Elm şəhərinin qapısını bağladılar və müsəlmanları heyrət və özbaşınalıqda qoydular. Onlar öz hökumətlərinin ilk günlərindən, Peyğəmbərdən (s) olan hədisləri yazmağı qadağan etməklə, hədis qondarmaqla, şübhələr yaratmaqla, hiyləgərlik və şeytani don geyindirmələrlə, günəş kimi parlaq olan İslam həqiqətlərini şəkk və tərəddüdün qara buludları arxasına atdılar.

Şübhəsiz ki, bütün hiylələrə baxmayaraq, İslam həqiqətləri və Peyğəmbərin (s) dürlü kəlamları İmam Əlinin (ə), o həzrətin vəsilərinin (ə) və bir dəstə vəfalı səhabələrin vasitəsilə tarix boyu zikr olundu. Beləcə, hər bir zaman kəsiyində bir növ cilvələndi. Onlar həqiqətləri bəyan etməklə iki fikirliliyi, şübhələri, şeytanın və İslam düşmənlərinin vahiməli təfəkkürünü cavablandırdılar və həqiqəti hamı üçün aşkarladılar.

Bu arada düzgün etiqadlı Şeyx əl-Müfid, Seyid Mürtəza, Şeyx Tusi, Xacə Nəsirəddin Tusi, Əllamə Hilli, Qazi Nurullah, Mir Hamid Hüseyn, Seyid Şərəfuddin, Əllamə Əmini və başqa alimlərin adları nur saçan ulduzlar kimi parlayır. Çünki onlar, İslam həqiqətlərini müdafiə etməkdə və Əhli-beyt (ə) məktəbinin həqiqətlərini bəyan etməkdə, dil və qələmlərilə şübhələri araşdırmağa və cavablandırmağa qalxdılar...

Bizim dövrümüzdə, gözəl qələmi və aydın bəyanı ilə İslam dininin parlaq həqiqətlərini bəyan etməyə və İmam Əlinin (ə) imamət və vilayətini elmi yollarla müdafiə etməyə qalxmış alim və mütəfəkkirlərdən biri də dəyərli tədqiqatçı, həzrət Ayətullah Seyid Əli əl-Hüseyni əl-Milanidir.

İslam Həqiqətləri Mərkəzi o yorulmaz təhqiqatçının dolğun və qiymətli əsərlərini dirçəltməyi öz proqramına salmışdır. Ona görə də o həzrətin əsərlərini təhqiq, nəşr və tərcümə etməklə onları alim, tələbə və həqiqət aşiqlərinin ixtiyarına vermişdir.

Qarşınızdakı kitab Ayətullah əl-Milaninin əsərlərindən birinin tərcüməsidir. Hazırda bu əsər azərbaycancaya tərcümə olunub və siz əzizlərə həqiqəti çatdırır.

Ümidvarıq ki, bu zəhmət Həzrət Bəqiyyətullah, Vəliyyi-əsr, İmam Zamanı (əc) razı salsın və həzrət bu əməli bəyənsin.

## Ön söz

Möminlərin əmiri İmam Əlinin (ə) imamətini isbat etmək üçün şiələrin həmişə dəlil gətirdikləri ayələrdən biri də, «Vilayət» ayəsidir. Allah-taala bu ayədə buyurur:

إِنَّمَا وَلِيُّكُمُ اللَّهُ وَرَسُولُهُ وَالَّذِينَ آمَنُوا الَّذِينَ يُقِيمُونَ الصَّلَاةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَهُمْ رَاكِعُونَ

*«Sizin vəliniz ancaq Allah, Onun Peyğəmbəri və o iman gətirənlərdir ki, namaz qılır və rükuda olduqları halda zəkat verirlər.»*[1]

Bu ayəyə istinad etmək və onu dəlil göstərmək üçün əvvəlcə rəvayətlərə müraciət edərək bu ayənin kimin haqqında nazil olmasını aydınlaşdırmalıyıq. Daha sonra sözügedən mübarək ayənin necə dəlil gətirilməsi müzakirə olunacaq. Sonda isə əhli-sünnə alimlərinin irad və etirazlarına cavab veriləcək. Buna əsasən, sözümüz üç hissədə deyiləcək:

***Birinci hissə:*** *«Vilayət» ayəsinin nazil olma səbəbi*

***İkinci hissə:*** *«Vilayət» ayəsində Əlinin (ə) imaməti*

***Üçüncü hissə:*** *«Vilayət» ayəsi barədə olan şübhələr*

[1] «Maidə surəsi», 55-ci ayə

## Birinci hissə

## Vilayət ayəsinin nazil olma səbəbi

Bu mübarək ayənin möminlərin əmiri İmam Əlinin (ə) öz üzüyünü rüku halında ehtiyaclı şəxsə bağışlayan zaman nazil olması barəsində bütün on iki imamçı şiələr yekdil rəyə malikdir və onların bu barədə rəvayətləri mütəvatir dərəcəsindədir.

Buna əsasən, onların fikrincə bu məsələ mütləqdir və onda heç bir tərəddüd yeri yoxdur.

Amma bu dəlillər əhli-sünnə üçün kifayət etmir və onların qarşısına bir neçə sual çıxır. O cümlədən:

- *Bu rəvayətlər əhli-sünnənin hədis və təfsir alimlərinin kitablarında gəlmişdirmi?*
- *Onlar bu rəvayətləri səhih və etimad olunası hesab etmişdirlərmi?*
- *Onu sübut etmək üçün qaneedici dəlil varmı?*

Biz bu hissədə müzakirə və dialoq qaydalarına riayət etməklə bu ayəni möminlərin əmiri İmam Əlinin (ə) haqqında nazil olduğunu qəbul edən əhli-sünnənin görkəmli alimlərinin bəzilərinin adlarını çəkirik. Belə ki, onların ardıcılları, onların kitablarını mötəbər hesab edən, rəvayətlərini höccət olaraq qəbul edən və onların məzhəb üsuluna bağlı olan şəxslər də qane olsunlar.

Bu məsələni bəyan etməklə ayənin nazil olma səbəbi də aydın olacaq. Habelə məlum olacaq ki, bu rəvayətlər şiə və sünni arasında ittifaq edilmiş və onları qəbul etdikləri rəvayətlərdir.

## Təfsir alimlərinin ayənin nazil olma səbəbində yekdil rəydə olması

Əhli-sünnənin görkəmli alimlərindən nəql edilənlərə əsasən «Vilayət» ayəsinin nazil olma səbəbində bütün təfsir alimləri yekdil rəydədirlər. Bu həmrəylik əhli-sünnə alimlərindən dördünün tərəfindən nəql edilmişdir:

1. əl-Qazi əl-İyci (vəfatı h.q. 756) «əl-Məvaqif fi ilm əl-kəlam» kitabının müəllifidir. Bu kitab kəlam və üsuliddin elmində əhli-sünnənin ən mühüm kitablarındandır. O yazır:

   وأجمع أئمة التفسير أن المراد علي

   *«Bütün təfsir alimləri demişlər ki, (bu mübarək ayədə) nəzərdə tutulan şəxs Əlidir.»*[2]

2. əş-Şərif əl-Curcani (vəfatı h.q. 816) «Şərh əl-məvaqif» kitabında bu icmanı etiraf etmişdir.[3]
3. Səd əd-Din ət-Təftazani (vəfatı h.q. 793) «Şərh əl-məqasid» kitabında bu mübarək ayənin möminlərin əmiri İmam Əli (ə) haqqında nazil olması barədə olan təfsirçilərin icmasını nəql etmişdir.[4]

«Şərh əl-məqasid» kitabı əhli-sünnənin kəlam elmində ən mühüm kitablarındandır. Bu kitab onların mədrəsələrində tədris olunur və onların elmi məclislərində özünə məxsus yer tutur. Buna görə də, əhli-sünnənin görkəmli alimlərinin bir çoxu bu kitaba şərh və izahlar yazmışlar.

---

[2] əl-Qazi əl-İyci, «əl-Məvaqif fi ilm əl-kəlam», s.405
[3] əş-Şərif əl-Cürcani, «Şərh əl-məvaqif», c.8, s.360
[4] Səad əd-Din ət-Təftazani, «Şərh əl-məqasid», c.5, s.170. Bu kitabın nə dərəcədə əhəmiyyətli olduğunu bilmək istəyənlər «Kəşf əz-zunun» kitabına baxa bilərlər.

4. Əla əd-Din əl-Quşci əs-Səmərqəndi də sözügedən mübarək ayənin möminlərin əmiri İmam Əlinin (ə) haqqında nazil olması barədə təfsir alimlərinin icmasını etiraf etmiş şəxslərdəndir.[5]

Yuxarıda adları qeyd edilən 4 əhli-sünnə aliminin sözlərinə əsasən bütün əhli-sünnə təfsirçiləri bu fikirdədirlər ki, bu mübarək ayə möminlərin əmiri İmam Əlinin (ə) haqqında və o həzrətin rükuda olan vaxt öz üzüyünü ehtiyaclı şəxsə bağışladığı zaman nazil olmuşdur.

Bu icma və yekdil rəyi əhli-sünnənin sözlərinə etimad etdikləri və kitablarına istinad etdikləri görkəmli alimləri nəql və etiraf etmişlər.

əl-Alusi öz təfsirində yazır:

وغالب الأخباريين على أنها نزلت في علي كرم الله تعالى وجهه

*«Hədis ravilərinin əksəriyyətinə görə, bu ayə Əlinin (kərəmallahu-vəchə) haqqında nazil olmuşdur.»*[6]

İbn Kəsir öz təfsirində bu rəvayətlərin bəzisini sözügedən ayənin altında nəql etmiş və onların bəzisinin səhih olduğuna hökm vermişdir.[7]

İbn Kəsir elə bir şəxsdir ki, özünün təfsir və tarix kitablarında bacardığı qədər şiələrə yuxarıdan aşağı baxmış və onların əqidələrini batil kimi qələmə verməyə çalışmışdır. Belə bir şəxsin bu rəvayətlərin səhih olmasını etiraf etməsinin böyük elmi dəyəri var və bizim düşmənə qaçmağa yol qoymur.[8]

---

[5] Əla əd-Din əl-Quşçi, «Şərh ət-təcrid», s.368.

[6] əl-Alusi, «Ruh əl-məani», c.6, s.168

[7] İbn Kəsir, «Təfsir», c.2, s.64.

[8] **Mühüm qeyd:** Seyid Əli əl-Milani burada İbn Kəsirin o rəvayətin sənədi barədə "لا يقدح به" - "la yuqdah bih" (sənəddə problem yoxdur) deməsinə istinad etmişdir. Amma bununla belə, bəzi şəxslər tərəfindən iddia edilir ki, həmin kitabın bir çox nüsxəsində İbn Kəsirin "لا يفرح به" – "la yufrah bih" (sənəd ürəkaçan deyil) deməsi qeyd edilib və "la yuqdah bih" ifdəsi çap səhvi nəticəsində meydana çıxıb. Bu iddiaya dəlil olaraq isə həmin sənəddə Muhəmməd əl-Kəlbi adlı ravinin İbn Kəsir tərəfindən "mətruk" (tərk edilmiş) hesab edilməsi qeyd edilir. Belə olduqda, hədisin ardınca "sənəddə problem yoxdur" deməsi məntiqsiz

Əhli-sünnənin rical elmindəki böyük alimlərinin dediklərinə müraciət etdikdən və onların (belə ki, onlar əhli-sünnənin məşhur hədis sənədi tənqidçilərindəndirlər) bu hədisin raviləri və nəql edənləri barədə sözlərini araşdırdıqdan sonra bu nəticə əldə olunur ki, bu hədislərin bir çoxu onların nəzərinə əsasən səhih və etimad olunasıdır.

O rəvayətlərdən biri İbn Əbu Hatimin öz təfsirində qeyd etdiyi hədisdir. O, bu hədisi Əbu Səid əl-Əşəcdən, o da Fəzl bin Dukeyndən, o Musa bin Qeys əl-Həzrəmidən, o da Sələmə bin Kuheyldən belə nəql edir:

تصدّق علي بخاتمه وهو راكع فنزلت الاية: (إِنَّمَا وَلِيُّكُمُ اللهُ وَرَسُولُهُ) إلى آخرها.

*«Əli rüku halında üzüyünü fəqir şəxsə bağışladı və bu ayə nazil oldu: «Sizin vəliniz ancaq Allah, Onun Peyğəmbəri...» - (ayə) sonadək (oxunur).*[9]

Bura qədər aydın oldu ki, bu hədisin səhihliyi müfəssirlərin (təfsir alimlərinin) ittifaq etdiyi bir məsələdir. Alusinin dediyinə əsasən çoxlu hədis alimləri o hədisi nəql etmişlər. Onların bəzisinin adlarına işarə olundu və ibn Kəsirin onlardan bəzisinin səhihliyinə aid olan sözü də nəql olundu.

Kəlam alimləri də imamətin dəlilləri haqqında bəhs edərkən hər iki tərəfin öz nəzərini isbat etmək üçün gətirdiyi dəlilləri zikr edərək belə deyirlər: Bu ayə həmin məxsus hadisədə nazil olmuşdur.[10]

---

alınır. Amma bununla belə, bəzi nəşrlərdə həmin ifadənin "la yuqdah bih" yazılması qətidir, misal olaraq "əl-Əzhər" Universitetinin Livandakı müdiri Şeyx Xəlil əl-Meysin təshihi (təhqiqi) ilə hazırlanmış "Dar əl-Qələm" nəşriyyatı tərəfindən çap edilən nüsxəni misal gətirmək olar. Nəzərə alsaq ki, hədis istilahında (terminologiyasında) "la yufrah bih" ifadəsi yoxdur, əvəzində isə "la yuqdah bih" ifadəsi mövcuddur və zəif olmayan, sənədində problem olmayan hədislərə deyilir, həmçinin nəzərə alsaq ki, İbn Kəsir başqa yerlərdə burda mətruk yazılan ravini (Muhəmməd əl-Kəlbini) qəbul edir, o zaman Seyid Əli əl-Milaninin iddiası doğru çıxır və dəfələrlə şahidi olduğumuz Əhli-beyt (ə) fəzilətləri barədə hədislərin və onlar haqqında xoş sözlərin qəsdən təhrif edilməsi faktlarına biri də əlavə edilmiş olur.

[9] «Təfsir İbn Əbi Hatim», c.4, s.1162

### Hədis alimlərinin nəzərində «Vilayət» ayəsi

Öndə gedən böyük hədis alimlərindən bir qrupu da müxtəlif əsrlərdə bu hədisi öz kitablarında nəql etmişlər. İndi isə bu hədisi öz əsərlərində qeyd etmiş bəzi şəxslərin adlarını burada zikr edirik:

1. Hafiz Əbd ər-Rəzzaq əs-Sənani.

O «əl-Musənnəf» kitabının müəllifi və Buxarinin («əs-Səhih» kitabının müəllifi) ustadı olmuşdur.

2. Hafiz Əbd bin Həmid. «əl-Müsnəd» kitabının müəllifidir.

3. Hafiz Rəzin bin Müaviyə əl-Əbdəri əl-Əndəlusi. O, «əl-Cəmi bəynə sihah əs-sittə» kitabını yazmışdır.

4. Hafiz ən-Nəsai. O, «əs-Sünən» kitabının müəllifidir və bu hədisi öz kitabında nəql etmişdir.

5. Hafiz Əbu Cəfər Məhəmməd bin Cərir ət-Təbəri.

O, «ət-Tarix» və «Cəmi əl-Bəyan an təvil ayət əl-Quran» kimi iki məşhur və tanınmış kitabın müəllifidir.

6. Hafiz İbn Əbu Hatim ər-Razi.

---

[10] **Redaktordan:** Əlavə olaraq, bu hədisin ravilərinin tərcümeyi-hallarını, etibarlılıq dərəcələrini də nəzərinizə çatdırmaq istərdik.

1. Əbu Səid əl-Əşəc: Kutubi-Sittənin (Səhih əl-Buxari, Səhih Müslim, əl-Cami ət-Tirmizi, Sünən Əbu Davud, Sünən İbn Macə, Sünən ən-Nisai) ravisidir. Əbu Hatim onun haqqında deyib: «siqədir, zamanın insanlarının imamıdır.» (əz-Zəhəbi, əl-Kaşif, c.2, s.91). İbn Həcər əl-Əsqəlani də onun siqə olduğunu bildirmişdir (İbn Həcər əl-Əsqəlani, Təqrib ət-təhzib, c.1, s.497, r.3354). İbn Hibban onu əs-Siqat əsərində zikr etmişdir (İbn Hibban, əs-Siqat, c.8, s.365).

2. Fəzl bin Dukeyn: Kutubi-Sittənin ravisidir. İbn Həcər əl-Əsqəlani onun siqə, səbt olduğunu bildirmişdir (İbn Həcər əl-Əsqəlani, Təqrib ət-təhzib, c.2, s.11, r.5418). əz-Zəhəbi isə hafiz və höccət olduğunu qeyd edib (əz-Zəhəbi, Mizan əl-itidal, c.3, s.350, r.6720).

3. Musa bin Qeys əl-Həzrəmi: Sünən Əbu Davud və Sünən ən-Nisainin ravisidir. İbn Həcər əl-Əsqəlani onun səduq ravi olduğunu deyib (İbn Həcər əl-Əsqəlani, Təqrib ət-təhzib, c.2, s.228, r.7003). əz-Zəhəbi və Yəhya bin Muin isə siqə olduğunu bildiriblər (əz-Zəhəbi, əl-Kaşif, c.2, s.307; İbn Əbu Hatim, əl-Cərh və ət-tədil, c.8, s.157).

4. Sələmə bin Kuheyl: Kutubi-Sittənin ravisidir. İbn Həcər əl-Əsqəlani onun siqə ravi olduğunu deyib (İbn Həcər əl-Əsqəlani, Təqrib ət-təhzib, c.1, s.378, r.2508). əl-Mizzinin qeydlərinə görə onu siqə hesab edən alimlər arasında əl-İcli, Yəhya bin Məin, Muhəmməd bin Səd, Əbu Zurə, Əbu Hatim də var (əl-Mizzi, Təhzib əl-kəmal, c.11, s.315-316).

O, çox məşhur hədis alimi və təfsirçidir. İbn Teymiyyə «Minhac əs-sunnə» kitabında qeyd edir ki, onun təfsiri hər növ uydurma və saxta rəvayətdən uzaqdır.

7. Hafiz Əbu əş-Şeyx əl-İsfahani.

8. Hafiz İbn Əsakir əd-Dəməşqi.

9. Hafiz Əbubəkr bin Mərdəveyh əl-İsfahani.

10. Hafiz Əbu əl-Qasim ət-Təbərani.

11. Hafiz əl-Xətib əl-Bağdadi.

12. Hafiz Əbu Bəkr əl-Heysəmi.

13. Hafiz Əbu əl-Fərəc bin əl-Cəuzi əl-Hənbəli.

14. Hafiz Muhibb ət-Təbəri. «Şeyxul-Hərəm» ləqəbi ilə tanınmışdır. Məkkəlidir.

15. Hafiz Cəlal əd-Din əs-Suyuti.

Əhli-sünnə bu fikirdədirlər ki, o, onuncu əsrin mücəddidi[11] və sünnəni dirçəldən olmuşdur.

16. Hafiz Şeyx Əli əl-Muttəqi əl-Hindi. O, «Kənz əl-ummal» kitabının müəllifidir.

əl-Buxarinin dövründən 11-ci əsrə qədər olan alimlər arasından bu görkəmli alimləri tanıtmaqla belə nəticəyə gəldik ki, təfsir alimləri bu hadisə üzərində icma etmiş, hədis alimlərinin və rəvayətləri nəql edənlərin çoxu bunu aşkar şəkildə qeyd etmişlər.

O rəvayətlərin sənədinə, onların səhih və mötəbər olmasına müraciət etdikdə və onları araşdırdıqda, bu rəvayətlərin onların öz prinsiplərinə uyğun olaraq mötəbər olması açıq-aşkar aydın olur.

---

[11] Hər yüz ildə bir gələn, bidətləri ortadan qaldıran və sünnəni bərpa edən şəxsdir.

## Məşhur şair Ənsarinin şeirində «Vilayət» ayəsi

Bu hadisənin xoş avazı o həddədir ki, məşhur şair olan Həssan bin Sabit əl-Ənsari[12] də möminlərin əmiri İmam Əlinin (ə) bu fəzilətini nəzmə çəkmişdir.

əl-Alusi əl-Bağdadi «Ruh əl-məani» kitabında yazır:

*«Həssan bin Sabit bu barədə möminlərin əmiri İmam Əliyə (ə) xitab edərək belə demişdir:*

فأنت الّذى أعطيت اذ كنت راكعاً *** زكاة فدتك النفس يا خير راكع

فأنزل فيك الله خير ولاية *** وأثبتها أثنى كتاب الشرايع

*Sən həmin şəxssən ki, rüku halında zəkat verdin.*

*Sənə can qurban olsun, ey ən yaxşı rüku edən!*

*Buna görə də, Allah sənin haqqında ən gözəl vilayəti nazil etdi*

*Və onu şəriətlər kitabında (Quranda) sabit etdi.»*[13]

## İbn Teymiyyənin nəzərində «Vilayət» ayəsi

Bütün bu deyilənlərdən sonra, nə bu rəvayətlərin sənədini ləkələmək, nə onu təkzib etmək, nə də onun rəvayətlərini zəif saymaq mümkündür.

İbn Teymiyyə də bu barədə və bu dəlil gətirmə haqqında fikir bildirmişdir. O yazır:

قد وضع بعض الكذّابين حديثاً مفترى أنّ هذه الاية نزلت في علي لمّا تصدّق بخاتمه في الصلاة، وهذا كذب بإجماع أهل العلم بالنقل، وكذبه بيّن.

---

[12] O, peyğəmbərin (s) səhabələrindən idi.

[13] əl-Alusi, «Ruh əl-məani», c.6, s.168

*«Bəzi yalançılar hədis uydurmuş və demişlər ki, bu ayə Əli namazda üzüyünü fəqir şəxsə bağışlayan zaman nazil olmuşdur. Bu rəvayət hədis alimlərinin icmasına*[14] *görə yalandır və onun yalan olması da aydındır».*

Sonra əlavə edir:

وأجمع أهل العلم بالنقل على أنّها لم تنزل في علي بخصوصه، وأنّ عليّاً لم يتصدّق بخاتمه في الصلاة، وأجمع أهل العلم بالحديث على أنّ القصّة المروية في ذلك من الكذب الموضوع، وأنّ جمهور الأُمّة لم تسمع هذا الخبر

*«Hədis alimlərinin icmasına görə, bu ayə Əlinin haqqında nazil olmayıb və Əli heç vaxt öz üzüyünü namaz halında fəqirə verməmişdir. Digər tərəfdən isə bütün hədis alimləri yekdil rəydədirlər ki, bu barədə nəql edilmiş hadisə yalan və uydurmadır. Ümmətin cumhuru (toplusu) belə bir hədis eşitməmişdir.»*[15]

Olduqca diqqət cəlb edən məsələdir! Biz, öz elmi məsələlərində gözü və qulağı bağlı şəkildə İbn Teymiyyənin ardıcılı olan və onun nəzərlərini qəbul edən hər bir şəxsə deyirik ki, ayılsınlar və görsünlər ki, öz əqidə, əhkam, sünnə və ədəblərini kimdən öyrənirlər!

İbn Teymiyyənin nəzərinə əsasən, Qazi əl-İyci, əş-Şərif əl-Curcani və adları əvvəldə sadalanmış görkəmli kəlam alimlərinin heç biri hədis alimi deyillər və buna görə də həzrət Muhəmməd (s) ümməti toplusundan xaricdirlər. Onlar etiraf etmişlər ki, bu ayənin möminlərin əmiri İmam Əlinin (ə) barəsində nazil olmasında bütün təfsir alimlərinin icma və ittifaqı var. Amma İbn Teymiyyə deyir: *«Bu hədisi bəzi yalançılar*

[14] İcma – bütün alimlərin eyni fikirdə olmasıdır.
[15] İbn Teymiyyə, «Minhac əs-sunnə», c.2, s.30

*uydurmuşdur və bütün hədis alimləri bu fikirdədirlər ki, Əli üzüyünü fəqirə verməmişdir»*.

Sanki onun elm əhli deməkdə məqsədi (belə ki, bu hədisin yalan olmasında icma edildiyini iddia edir) yalnız onun özü, yaxud onun ətrafına toplanmış bəzi şəxslərdir. Onun ətrafında olanlardan iki-üç nəfərin belə bir fikir yürütdüyünü gördüyü üçün iddia edib ki, nəinki bütün hədis alimləri və rəvayət nəql edənlər onun nəzəriyyəsi üzərində icma və ittifaq etmişlər, hətta bütün İslam ümməti də bu məsələdə icma etmişlər.

Sanki icma onun cibindədir və istədiyi vaxt onu cibindən çıxarıb camaata göstərir. Digər tərəfdən də camaata da borc bilmişdir ki, onun hər iddiasını qəbul etsinlər.

## Son nəticə

Deyilənlərdən belə nəticəyə gəlmək olar ki, bu hadisə məşhurdur və həm şiələrin, həm də sünnilərin kitablarında mövcuddur.

Biz bu yazıda onların bəzisinə işarə etdik. Amma bu hədisin raviləri – *belə ki, onların bəzisi sənədlə və başqa bir dəstəsi də mürsəl şəkildə bu hədisi nəql etmişlər* - bizim saydıqlarımızdan daha çoxdurlar.[16] Onların heç biri Muhəmməd (s) peyğəmbərin ümmətindən sayılmırlar?!

Buna əsasən, bu hədisin haqqında – istər sənəd, istər mübarək ayənin nazil olma səbəbi, istərsə də onun dəlaləti baxımından – heç bir şəkk-şübhə və münaqişə yeri yoxdur. Bu ayə möminlərin əmiri İmam Əlinin (ə)

[16] Daha ətraflı məlumat üçün bax: «Təfsir Təbəri», c.6, s.186; «Təfsir İbn Əbu Hatim», c.4, s.1162; «Ruh əl-məani», c.2, s.47; «Əsbab ən-nuzul», s.113; «Təfsir əl-İzz əd-Diməşqi», c.1, s.393; «Təfsir İbn Kəsir», c.2, s.64; «əl-Kəşşaf», c.1, s.649; «əd-Durr əl-mənsur», c.3, s.105. Habelə, Fəxr Razinin, əl-Bəğəvinin, ən-Nəsəfinin, əl-Qurtubinin, Əbu əs-Səudun, əş-Şəvkaninin, əl-Alusinin təfsirinə bax. Hədis kitablarından da, «Cami əl-usul», c.9, s.478; «əl-Mucəm əl-əusat», c.7, s.129; «Tarix Dəməşq», c.42, s.356.

haqqında və o həzrətin rüku halında üzüyünü fəqirə bağışlayan zaman nazil olmuşdur.

**İkinci hissə**

## «Vilayət» ayəsində Əlinin (ə) imaməti

Bir az öncə «Vilayət» ayəsinin möminlərin əmiri İmam Əlinin (ə) imamətin bəyan edən ayələrdən biri olduğu qeyd edildi. Bu mübarək ayəyə necə istidlal etməyin aydın olması üçün əvvəlcə ayənin bəzi sözləri izah edilməli və ayə bir daha araşdırılmalıdır. Qurani-Kərimdə belə oxuyuruq:

«انما وليّكم الله ورسوله والّذين آمنوا الّذين يقيمون الصّلاة ويؤتون الزّكاة وهم راكعون»

*«Sizin vəliniz ancaq Allah, Onun Peyğəmbəri və o iman gətirənlərdir ki, namaz qılır və rükuda olduqları halda zəkat verirlər.»*[17]

İlk baxışda iki sözün araşdırılması nəzərə çarpır; «إنّما» (ancaq) və «وليّكم» (sizin vəliniz).

Şübhəsiz ki, «إنّما» (ancaq) sözü ərəb dilində «həsr» mənasındadır. Həsr - bir hökmü ancaq müəyyən bir obyektə məxsus etmək anlamındadır. Belə ki, o hökm yalnız həmin obyektə məxsus olsun və başqa heç kəs, yaxud heç bir şey o hökmə malik olmasın.

Bu məna, «إنّما» (ancaq) sözü haqqında hamının qəbul etdiyi məsələdir və heç kəs bunu inkar etməmişdir.

## «Vilayət» nədir?

Araşdırılması lazım olan ikinci söz isə «وليّكم» (sizin vəliniz) sözüdür. Hazırda bu sual ortaya çıxır ki, «vilayət»in mənası nədir?

Allahın peyğəmbəri (s) «Vilayət hədisi» kimi məşhurlaşmış hədisdə buyurmuşdur:

[17] «Maidə» surəsi, 55-ci ayə.

«علی منّی وأنا من علیّ وهو ولیّکم بعدي»

*«Əli məndəndir, mən də Əlidən. O məndən sonra sizin vəlinizdir.»*[18]

Buna əsasən, «vilayət» sözü həm bu ayədə, həm də bu hədisdə «ولیّکم» (sizin vəliniz) ibarəsi ilə gəlmişdir.

«Vilayət» sözünün lüğət baxımından müxtəlif mənaları vardır. Bu müxtəlif mənalar ya bir mənada müştərəkdirlər, ya da deyillər. Əgər müştərək olsalar onların hər biri o mənanın bir obyekti və nümunəsi sayılacaqlar. Belə ki, buna məna baxımından müştərək olma deyilir. Əgər bir-birləri ilə heç bir ortaqlığı olmasa, yalnız sözdə ortaqdırlar. Belə olan halda ona ləfzi ortaqlıq deyilir.

«Vilayət»in ilk mənası, məna baxımından müştərək olandır. Yəni, «vilayət» həmişə bir mənada gəlir və başqa mənaların hər biri həqiqi mənanın bir nümunəsi olacaqdır. Yəni, başqa bir işi öhdəsinə götürmək.

Misal olaraq, əgər deyilsə ki, «Filankəs filankəsin vəlisidir», yəni, o ikinci şəxsin işlərini öhdəsinə götürəndir. Yaxud deyilsə ki, «Bu şəxs bu balaca uşağın vəlisidir», yəni, o uşağın işlərinin məsuliyyətini öhdəsinə götürmüşdür.

Habelə, «ولیّ امر» (əmr sahibi, ixtiyar sahibi, işin hamisi) o şəxsə deyilir ki, o məsələnin bütün işləri onun öhdəsində olsun. Buna görə də sultan və padşaha «vəli» (hami, ixtiyar sahibi) deyilir. Çünki, ölkənin işlərinin hamısı onun öhdəsindədir və o ölkəni idarə etmək məsuliyyətini öhdəsinə götürmüşdür.

[18] İbn Macə, «əs-Sunən», c.1, s.89; Əhməd bin Hənbəl, «əl-Musnəd», c.5, s.171; əl-Müttəqi əl-Hindi, «Kənz əl-ummal», c.11, s.603, №32913

Bu məna, vilayətin həqiqi mənasıdır. Buna görə də harada «vilayət» sözü işlənirsə, orada bu məna nəzərə alınır.

Misal olaraq, dost, yoldaş və qonşuya «vəli» deyilir. Sizə yardım etmək üçün, sizinlə müqavilə bağlayan və and içən şəxsə «vəli» deyilir. Ata «vəli»dir. Allah-taala «vəli»dir. Onun peyğəmbəri (s) də «vəli»dir. Bu mənada başqa nümunələr də var ki, onlara da «vəli» deyilir.

Bu məna «vilayət» sözünün işləndiyi bütün nümunələrdə vardır. Qonşuya «vəli» deyilirsə, bu o deməkdir ki, o öz qonşusunun işlərini görməyə və onun işlərini öhdəsinə götürmək üçün ən layiqli şəxsdir.

Əgər bir şəxsin qarşısına bir problem çıxsa, ona yardım etmək üçün tələsən, onun o problemini həll etməkdə kömək edən və o şəxsin işlərini öhdəsinə götürən ən yaxın şəxs, onun qonşusudur. Buna qonşuluq haqqı da deyilir.

Müqavilə bağlayan şəxs, yaxud başqasına köməyə gələn şəxs və ya insanın qardaşı, hər biri bir növ vilayətə sahibdirlər. Amma bütün bu məqamlarda bir ortaq məna var ki, o da başqasının işini görməyə çalışmaq və məsuliyyəti öhdəyə götürməkdir.

Lüğət kitablarını araşdırdıqda və bu fənnin mütəxəssislərinin sözlərinə baxdıqda, tamamilə aydın olur ki, onların hamısı «vilayət» sözü üçün bu əsas mənanı bəyan etmişlər.

Əgər desək ki; «Vilayət» sözü ləfz baxımından müştərəkdir, yəni, «vilayət»in müxtəlif məna və nümunələri var. Halbuki o mənalar arasında ortaq məqam yoxdur. Məsələn, «عين» (eyn) sözü kimi. Ərəb dilində ona ləfz baxımından müştərək deyilir. Çünki müxtəlif mənalarda işlənir. O cümlədən; su bulağı, insanın gözü, günəş və ...

Gördüyünüz kimi bu müxtəlif mənalar ortaq məna deyillər. Əksinə, hərəsinin özünə məxsus mənası var. Bu məsələ üsul elmində geniş şəkildə bəyan edilmişdir.

Buna əsasən, əgər dediklərimizdən vaz keçdiyimizi fərz etsək və desək ki, «vilayət» sözü ləfz baxımından müştərəkdir o zaman müxtəlif mənalara malik olacaqdır. O mənalardan biri budur: Bir şeyə daha layiq olmaq və bir iş qarşısında daha üstün olmaq.

Ləfz baxımından müştərək olan yerlərdə o sözün hansı mənada işləndiyini başa düşmək üçün danışanın məqsəd və hədəfini müəyyən edən əlamət və nişanələrə (qərinə-qərain) və sözün mənasını müəyyən edən işlənmə xüsusiyyətinə (şahid-şəvahid) diqqət etməliyik.

Buna əsasən, bu mübarək ayədə olan əlamət və nişanələrə diqqət etməliyik ki, «vilayət» sözünün bu ayədə hansı mənada işləndiyi aydın olsun.

## Mübarək ayədəki «vilayət»in mənası

Deyilənlərə əsasən, bu ayədə «vilayət» sözünün şiələrin dediyi anlamda - yəni müsəlmanların işini öhdəsinə götürmək üçün ən layiqli və ən üstün olmaq - anlamında olduğunu sübut edən müxtəlif əlamət və nişanələr var.

Danışan şəxsin məqsədini və hədəfini müəyyən edən əlamət və nişanələr (qərinə-qərain) iki cürdür; «Qərain məqamiyyə» və «qərain ləfziyyə». «Qərain məqamiyyə» ayənin nazil olduğu məqam və zamana diqqət etməkdir. Bu qərinələrlə məlum olur ki, «vilayət» sözünün mənası müsəlmanların işlərinə rəhbərlikdə üstün və ləyaqətli olmaqdır.

Qərinələrin bir neçəsi isə peyğəmbərin (s) özünün bəyanlarıdır. Buna da «ləfziyyə» qərinələri deyilir. Bu «ləfzi qərinələrin» bir hissəsi bu barədə deyilmiş rəvayətlərdirlər.

## Fəzl b. Ruzbəhanın mübarək ayə və «vilayətin mənası barədə olan nəzəri

Fəzl b. Ruzbəhan da bu barədə fikir bildirmişdir. O, Əllamə Hillinin (rə) nəzərini rədd etmək məqsədilə yazır:

*«Qərinələr və şahidlər dəlalət edir ki, burada «vilayət»dən məqsəd yardım və köməkdir. Buna əsasən, « انّما وليّكم الله ورسوله والّذين آمنوا...» ayəsindən məqsəd budur ki, sizin köməkçiniz Allah, Onun peyğəmbəri (s) və namaz qılan və rüku halında sədəqə verən şəxslərdir.»*[19]

## İbn Ruzbəhanın nəzərinin rəddi

«Vilayət»in mənalarından birinin kömək və yardım olması doğrudur. Necə ki, lüğət kitablarında da gəlmişdir. Amma bu barədə gəlmiş rəvayətlər bunu göstərir ki, burada «vilayət»dən məqsəd kömək və yardım deyil.

Fəxr Razinin və Sə`ləbinin təfsir kitablarında və başqa kitablarda gəlmiş nümunələrə diqqət edin:

«أنَّ النّبيّ لمّا علم بأنّ علياً تصدّق بخاتمه للسّائل تضرّع إلى الله و قال: اللهم إنّ أخي موسى سألك قال: (ربّ اشرح لى صدرى و يسّرلى أمرى و احلل عقدةً من لسانى يفقهوا قولى و اجعل لى وزيراً من أهلى هارون أخى اشدُد به أزرى و أشركه في أمري كي نسبّحك كثيراً و نذكرك كثيراً انك كنت بنا بصيراً.)

---

[19] «İhqaq əl-həqq», c.2, s.408

فأوحيت إليه: (قد أُوتيت سُؤلك يا موسى)

اللهم و إنّى عبدك و نبيّك فاشرح لي صدري و يسّرلي أمري و اجعل لي وزيراً من أهلي علياً أشدد به ظهرى

قال ابوذر: فوالله، ما استتمّ رسول الله صلى الله عليه و آله الكلمة حتّى هبط عليه الأمين جبرائيل بهذه الآية: (إنّما وليكم الله و رسوله...) إلى آخر الآية»

*«Peyğəmbər (s) Əlinin (ə) öz üzüyünü fəqirə verdiyini bilən kimi əlini duaya qaldıraraq Allahın dərgahına yalvarışla belə dedi: - «İlahi! Qardaşım Musa (ə) səndən istəyərək belə dedi: - «Ey Rəbbim! Köksümü açıb genişləndir; İşimi yüngülləşdir; Dilimdəki düyünü aç ki, sözümü yaxşı anlasınlar! Və mənə öz ailəmdən bir vəzir ver – Qardaşım Harunu! Onunla arxamı möhkəmləndir. Onu işimə ortaq et ki, Səni çox təqdis edib şaninə təriflər deyək. Və Səni çox zikr edək. Sən, şübhəsiz ki, Bizi görürsən!»*

*Sonra Sən ona vəhy etdin: «Dilədiyin sənə verildi, ey Musa!»*[20]

*İlahi! Mən də Sənin bəndə və peyğəmbərinəm. Belə isə mənim köksümü açıb genişlət və dözümlü et. İşimi yüngülləşdir; Və mənə öz ailəmdən bir vəzir ver – Əlini! Onunla arxamı möhkəmləndir...*

*Əbuzər deyir: -Allaha and olsun! Hələ peyğəmbərin (s) duası sona çatmamışdı ki, Cəbrail Əmin nazil oldu və bu ayəni gətirdi:*

*«Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri...» ayənin sonuna qədər.»*[21]

Heç Quranın lüğət və üslubuna, peyğəmbərin (s) buyurduqlarına azacıq diqqət etmiş ağıllı və düşüncəli insan bu ayədəki «vilayət»in bu qərinələrlə kömək və yardım anlamında olduğunu qəbul edə bilərmi?!

[20] «Taha» surəsi, 25-36-cı ayələr.
[21] Fəxr ər-Razi, «Məfatih əl-ğəyb», c.11, s.25; əs-Sələbi, «əl-Kəşf və əl-bəyan»

İnsanın ağlı qəbul edərmi ki, Allahın Rəsulu (s) Allahın dərgahına yalvarış və iltimasla dua etsin ki, Allah camaata Əlinin (ə) onlara köməkçi olduğunu elan etsin?!

Peyğəmbər (s) belə bir hal və belə bir vəziyyətdə əlini duaya qaldırdı ki, onun istəyi Allahın Əlini möminlərin köməkçisi olması barədə və camaata başa salması haqqında bir ayə nazil etməsi olsun?

Kiminsə İmam Əli (ə) möminlərin köməkçisi olmasına şəkki var idi ki, peyğəmbər (s) əlacsız qalıb əlini duaya qaldırsın və beləcə razü-niyaz etsin? Peyğəmbərin (s) duası bitəndən sonra, bu ayə nazil olsun:

*«Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir...»*

Bu qədər qərinə və şahidlərin olmasına rəğmən «وليّكم» (vəliyyukum – sizin vəliniz, haminiz) sözündən məqsəd köməkçi və yardımçı olduğunu demək düzdürmü?

## Araşdırmanın nəticəsi

«Vilayət» sözünün mənası haqqındakı araşdırmanın son sözü budur ki, əgər «vilayət» ləfzi baxımdan müştərək olsa və Allahın istədiyi mənanı təyin etmək üçün bizim qərinəyə ehtiyacımız olsa, ləfziyyə və məqamiyyə qərinələri «vilayət» sözünün mənasını aşkar və aydın edir.

Belə olan halda «vilayət» sözünün mənası, müsəlmanların məsuliyyətini öhdəyə almaqda daha layiqli və daha üstün olmaq anlamındadır. Bu üstünlük Allah, Onun peyğəmbəri və namaz qılıb, rüku halında sədəqə verən möminlər üçün sabitdir.

Bu mübarək ayədəki «إنّما» (innəma - ancaq) və «ولايت» (vilayət) sözləri araşdırıldıqdan sonra deyə bilərik ki, «و الذين آمنوا» (Vəlləzinə amənu-və

iman gətirənlərdir) sözündəki «و» (və-vav hərfi) ətf etmək üçündür. Yəni, Allah və peyğəmbərdən (s) başqa, bu dəstənin də sizin üzərinizdə vilayəti var.

Amma, «و هم راكعون» (və rükuda olduqları halda) ibarəsində gələn «و» (vav) hərfi «hal vav»ıdır. Yəni, rüku halında zəkat verirlər.

Bütün bu məqamlara diqqət etdikdə demək olar ki, (innəma vəliyyukum) yəni, Yalnız Allah, Onun peyğəmbəri (s) və namaz qılıb rüku halında zəkat verən möminlər sizə vəli və hami sayılırlar.

Bura qədər bu nəticəni əldə etdik ki, həm Quran və həm də rəvayətlər bu mənanı aydın etdilər ki, kim namazın rükusu halında sədəqə vermiş və bu ayə kimin haqqında nazil olmuşdur.

## Üçüncü hissə

## Vilayət ayəsi barədə olan şübhələr

Vilayət ayəsi haqqında deyilən güclü dəlillərə diqqət etsək, onun mənası aydın olmuşdur. Bu arada, sözügedən dəlillərə etiraz və iradlar da edilmişdir. Belə ki, onlara cavab verməyimiz lazımdır ki, heç bir şəkk və şübhə yeri qalmasın.

Biz ötən bəhslərdə «Şeyxül-islam» İbn Teymiyyənin etirazına işarə etdik və dedik ki; Onun sözü etiraz olmazdan öncə, şiələrə rəva gördüyü iftira və töhmətdir. Doğrusu, bu etiraz nəinki şiələrə iftiradır, hətta əhli-sünnənin bir çox təfsirçi, hədisşünas, görkəmli alim və kəlamçılarına da iftira və töhmət sayılır. Belə ki, onların hamısını yalançı saymışdır.

Əlbəttə, İbn Teymiyyənin kitabında üslubu belədir. Mən onun kitabını əvvəldən axıra qədər araşdırdım və elə məqamlar əldə etdim ki, əgər bir şəxs ona agah olsa, nəinki onu, hətta daha da irəli gedərək onu «Şeyxül-islam» adlandıran şəxsi də kafir sayacaq.

### Birinci şübhə: Vilayətin mənası

İlk şübhə «vilayət»in mənasındadır ki, daha öncə bəyan edildi və xülasə şəkildə ona cavab verdik. Bu şübhəni Fəzl b. Ruzbəhan «İbtal əl-batil» (batili batil etmək) kitabında yazmışdır. O, bu kitabı Əllamə Hilliyə (rə) rəddiyyə olaraq yazmışdır.

Ondan sonra Seyid Qazi Nurullah Tustəri «İhqaq əl-həqq» və Şeyx Məhəmməd Həsən Müzəffər «Dəlail əs-sidq» kitabında onu tənqid etmiş və onun iradlarına cavab vermişlər.

**İkinci şübhə: «Vav» hərfi hal üçündür yoxsa ətf üçün?**

Bu barədə ortaya atılmış iradlardan biri də budur ki, bəziləri « و هم راكعون» (və hum rakiun-rükuda olan halda) sözündəki «vav» hərfinin ətf üçün olduğunu, hal üçün olmadığı ehtimalını irəli sürmüşlər.[22] Buna əsasən ayəni belə oxuyuruq:

«انّما وليّكم الله ورسوله والّذين آمنوا الّذين يقيمون الصّلاة ويؤتون الزّكاة وهم راكعون»

*«Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, namaz qılır, zəkat verir və rüku edirlər.»*

Nəinki rüku halında zəkat verirlər, əksinə, onlar bir-birindən ayrı üç iş görürlər: Həm namaz qılırlar, həm zəkat verirlər, həm də Allah qarşısında rüku edirlər.

Bu baxımdan bu mübarək ayənin üzüyü bağışlamaqla heç bir əlaqəsi yoxdur.

Həqiqət budur ki, əgər bu ehtimal bu ayəyə uyğun olsa və səhih olsa, daha bu ayəni dəlil gətirə bilmərik. Çünki məşhur məsələ budur ki, əgər bir ehtimal dəlilin ziddinə olsa, o dəlil ləkələnəcək və aradan gedəcək.

**Cavab:**

Sözügedən hadisə haqqında gəlmiş rəvayətlərə ötəri bir nəzər saldıqda, bu ehtimal olduqca tez aradan gedir və onun üçün heç bir yer qalmır.

[22] Daha öncə dedik ki, ətf «vav»ı dedikdə məqsəd budur ki, sonrakı cümləni ətf vasitəsilə öncəki cümləyə bağlasın. Onu əvvəlki cümlədə olan hökmlə şərik etsin. Lakin hal «vav»ı işin görülmə halını bəyan edir. Misal olaraq «جاء زيد وعَمْرو» (Caə Zəydun və Əmrun) yəni «Zeyd və Əmr gəldilər» cümləsində «vav» hərfi ətf üçündür. Amma «جاء زيد وهو قائم» (Caə Zeydun və huvə qaim) yəni «Zeyd ayaq üstə olan halda gəldi» cümləsindəki «vav» isə hal üçündür. Bu iki nəzərlə ayənin mənası fərqli olacaqdır.

Əgər «əd-Durrul-mənsur» təfsirinə baxsaq və o rəvayətləri müşahidə etsək, bu nəticəni əldə edəcəyik ki, bu «vav» hal üçündür, ətf üçün deyil.

Bu kitabda, habelə başqa kitablarda da vilayət ayəsinin altında belə rəvayət olunmuşdur:

«تصدّق عليّ وهو راكع»

*«Əli (ə) rükuda olan halda sədəqə verdi.»*[23]

Habelə, «əd-Durr əl-mənsur» təfsirində başqa bir rəvayətdə belə deyilir:

«أنّ النبي صلى الله عليه وآله سأل السائل، سأل ذلك المسكين الّذي أعطاه الإمام خاتمه،
سأله قائلاً: «على أيّ حال أعطاكه» ـ أى الخاتم ـ ؟
قال: أعطاني وهو راكع»

*«Peyğəmbər (s) İmam üzüyünü bağışladığı fəqirdən soruşdu: «Hansı halda üzüyü sənə bağışladı?»*

*Dedi: «Ruku halında mənə bağışladı.»*[24]

Bəli, peyğəmbər (s) özü fəqirdən soruşur ki, Əli (ə) hansı halda üzüyü sənə vermişdir. Buna əsasən «vav» hal üçündür və bu irad və ehtimal üçün heç bir yer yoxdur.

**Üçüncü şübhə: Əli (ə) Allaha diqqət edirdi, yoxsa fəqirə?**

Vilayət ayəsi dəlili barədə ortaya atılmış üçüncü şübhə, üç istiqamətdən bəyan edilmişdir:

1. Əli (ə) bu üzüyü hardan gətirmişdi? Bu üzüyə necə yiyələnmişdi?

2. Bu üzüyün dəyəri nə qədər idi? O dövürdə onun qiyməti nə qədər idi?

[23] «Təfsir İbn Əbu Hatim», c.4, s.1162
[24] «əd-Durr əl-mənsur fi ət-təfsir bi əl-məsur», c.3, s.105

Bu cür etirazların müzakirə və mübahisəyə layiq olmadığı aydındır. Onların yanından ali-cənablıqla keçmək daha yaxşıdır.

3. Möminlərin əmiri İmam Əli (ə) elə bir şəxs idi ki, namaz zamanı onun bütün diqqəti Allah-taalaya idi. Allahdan başqasına heç bir diqqəti yox idi. Hətta bəzi rəvayətlərdə belə deyilib: Müharibələrin birində o həzrətin ayağına bir ox batdı. O oxu çölə çıxartmaq istəyirdilər. Bir nəfər dedi: Səbr edin ki, İmam namaza başlasın. Oxu o zaman ayağından çıxarın. Çünki o, namaz vaxtı ağrı hiss etmir.

Bu rəvayətə əsasən, o həzrət o ehtiyaclı şəxsin səsini necə eşitdi və ona diqqət etdi? Necə ona işarə etdi ki, yaxına gəl, sonra əlini uzatdı ki, o üzüyü onun barmağından çıxarsın?

Bu işlərin hamısı dünya məsələlərinə məşğul olmaqdır. İnsanın Allahla razü-niyaz zamanı dünya işlərinə diqqət etməsi bəyənilən deyil.

Öncəki irad, yəni, «vav» hərfini hal üçün deyil ətf üçün bilmək iradı nəhv elminə (ərəb qrammatikasına) aid irad idi. Birinci irad isə vilayət sözünün mənası haqqında idi və lüğət elminə aid irad idi. Amma bu irad irfana aid iraddır. Çünki möminlərin əmiri İmam Əli (ə) öz Allahı ilə söhbət edir və bir-birilə pıçıldaşırlar. O, Allaha diqqətdə qərq olub və namaz qılmaqla məşğuldur. Belə olan şəraitdə o həzrət necə bu dünyaya diqqət edir?

**Cavab:**

Bu şübhəyə bir neçə istiqamətdən cavab vermək olar:

Birinci: Allah-taala bu hadisəni möminlərin əmiri İmam Əlinin (ə) fəzilətlərindən saymış və o həzrəti Quranda mədh etmişdir.

Peyğəmbər (s) də Əmirəl-möminin Əlinin (ə) rüku halında üzük bağışlamasını onun fəzilətlərindən saymışdır.

Möminlər və müsəlmanlar bu ayənin nazil olduğu zamandan bu günə kimi onu, o rəhmət imamının fəzilət və xüsusiyyətlərindən saymışlar.

Məlum məsələdir ki, əgər imamın bu hərəkətində ən kiçik bir irad olsaydı, bu əməl heç vaxt möminlərin əmiri İmam Əlinin (ə) fəzilət və üstünlüklərindən sayılmazdı.

İkinci: Möminlərin əmiri İmam Əli (ə) namazda dünya işlərinə diqqət etməyib. Əksinə, onun bütün diqqəti Allaha və bəndəlik vəzifəsini icra etməyə yönəlmişdi. Həqiqətdə fəqirə sədəqə vermək bir ibadətin əsnasında başqa bir ibadəti yerinə yetirmək olub və bu Allahın sevdiyi işdir.

Bəlkə də yaxşı olar ki, bu şübhəyə cavab olaraq əhli-sünnənin irfani zövqü olan görkəmli alimlərinə müraciət edək.

əl-Alusi bu barədə yazır: - Həmin sualı İbn Cəvzidən[25] soruşdular. O cavab olaraq bu iki beyt şeiri oxudu:

يسقى و يشرب ولا تلهيه سكرته *** عن النديم ولا يلهو عن الناس

أُطاعه سُكرُهُ حتّى تمكّن من *** فعلِ الصحاةِ فهذا واحد الناس

İçir və içirdir. Onun məstliyi, onun saqiyə olan diqqətini yayındırmır və camaatdan qafil etmir.

Onun məstliyi onun ixtiyarındadır. Bu qədər ki, ayıq insanlar kimi əməl edə bilib. Deməli o, bu insanlar içərisində yeganədir.[26]

Bu şeiri təəssübkeş İbn əl-Cəvzi əl-Hənbəli demişdir. O elə bir şəxsdir ki, İbn Teymiyyə və Fəzl b. Ruzbəhan kimilər möminlərin əmiri İmam

---

[25] Qeyd etmək lazımdır ki, İbn əl-Cəuzi Sibt bin əl-Cəuzinin babasıdır. Bu məqama diqqət etmək lazımdır. Çünki, bəzən İbn əl-Cəuzi ilə Sibt bin əl-Cəuzi arasında səhv olur. Burada məqsəd Əbu əl-Fərəc bin əl-Cəuzi əl-Hənbəlidir. O hədis hafizi və çoxsaylı əsərlərin müəllifidir. H.q. 597-ci ildə vəfat edib.
[26] «Ruh əl-məani», c.6, s.169

Əlinin (ə) fəzilətlərini rədd etmək üçün onun kitablarına etimad edirlər. Amma o da bu irad və şübhənin cavabında sakit qalmır və bu şeirlə şübhəyə cavab verir.

Digər tərəfdən isə möminlərin əmiri İmam Əli (ə) öz xüsusiyyətlərində «جامع الأضداد» (cami əl-əzdad - ziddiyyətləri toplayan) olmuşdur. Yəni, ziddiyyətli xüsusiyyətləri özündə toplamışdı. Əgər belə olmasaydı dövranın yeganəsi olmazdı və bu qədər fəzilət və üstünlüklər ona məxsus olmazdı. Əgər belə olmasaydı, Allah Rəsulunun (s) vəsisi (xəlifəsi) və Fatimə Zəhranın (ə) bənzəri və onun şənində olan birisi olmazdı.

Buna əsasən, heç kəs möminlərin əmiri İmam Əli (ə) haqqında bu iradı qəbul etmir ki, Əli (ə) namazda dünya işlərinə diqqət edib və Allahla ünsiyyət və Ona diqqətdən qəflətə düşüb.

Bəli, bizim rəvayətlərdə gəlib ki, Ömər b. Xəttab demişdir: - Mən öz üzüyümü qırx dəfə fəqirə bağışladım, amma mənim haqqımda bir ayə də nazil olmadı![27]

Bəyan olunanlara əsasən, aydın oldu ki, bu irad da öncəki iradlar kimi yersizdir və qəbul olunası deyil.

**Dördüncü şübhə: Sözügedən ayə cəmə xitab edir, amma Əli (ə) təkdir**

Vilayət ayəsi haqqında bildirilmiş mühüm və elmi əsası olan etiraz budur ki, Əli (ə) bir nəfərdir, amma bu ayədə Allah cəm sözü ilə xitab etmişdir. Bu o deməkdir ki, ayənin müxatəbləri bir nəfərdən daha çox olmuşlar. Allah-taala buyurur:

[27] Əlbəttə, bu rəvayəti indiyə qədər əhli-sünnə kitablarında görməmişəm.

«والّذين آمنوا الّذين يقيمون الصّلاة ويؤتون الزّكاة وهم راكعون»

*«Və iman gətirənlərdir. O kəslər ki, namaz qılır və rükuda olduqları halda zəkat verirlər.»*

**Cavab:**

Bu iradın gözəl zahiri var və başqa yerlərdə də bildirilmişdir. Çünki başqa ayələr də var ki, orada söz cəmdə işlənib, amma məqsəd bir nəfərdir. Məsələn, «Mübahilə» ayəsində Allah buyurur:

«...وانفسنا وانفسكم»

*«Biz də öz canlarımızı, siz də öz canlarınızı».*

Halbuki peyğəmbər (s) yalnız həzrət Əlini (ə) özü ilə apardı. Habelə, peyğəmbər qadınlar arasından yalnız Həzrət Fatiməni (ə) özü ilə apardı. Halbuki mübarək ayədə belə buyurulur:

«ونسائنا ونسائكم»

*«Biz də qadınlarımızı, siz də qadınlarınızı».*

Bu etirazın başqa elmi müzakirələrdə də qarşıya çıxarılması mümkündür. Çünki bəzi ayələrdə cəm sözünün gəlməsi, amma məqsədin bir nəfər olması mümkündür.

### Zəməxşərinin cavabı

Aydın məsələdir ki, çoxlu alimlər bu etiraza cavab vermişlər. O cümlədən, Əhli-sünnənin görkəmli alimlərindən və müxtəlif elmlərdə əsərləri olan Zəməxşəri.

Onun Quran təfsirində «Kəşşaf» adlı məşhur kitabı var. Onun başqa təfsirlərdən üstünlüyü bundadır ki, Quranı ədəbi və bəlağət baxımından

təfsir edir. Bu məsələ fənn əhli və təcrübəli şəxslər arasında aydın və aşkar məsələdir. O sözügedən kitabda bu suala belə cavab verir:

«Belə vəziyyətlərdə cəm sözünün gəlməsi buna görədir ki, başqaları da bu işi görməyə təşviq edilsinlər. Camaatın diqqətini bu məqama yönəltsin ki, mömin fəqir və əlacsız şəxslərə ehsan etməyə o qədər həris olmalıdır ki, hətta namaz halında da ehtiyaclı şəxslərə kömək və ehsan etməkdən qafil olmamalıdır. Bu, bütün möminlərdən istənilmiş şeydir. Buna görə də ayə cəm sözü ilə gəlmişdir».

Zəməxşərinin bu cavabını başqa alimlərin çoxu bəyənmişlər. Əgər bu səbəb şübhə icad edənlər üçün qaneedici olmasa, deməliyik ki, bir çox ayə, rəvayət və ərəb fəsihlərinin sözlərinə də bu irad tutulmalıdır.

Biz hamımız bilirik ki, Qurani-kərimdə, peyğəmbərdən (s) nəql olunmuş səhih hədislərdə, habelə fəsih ərəb dilində çoxlu nümunələr gözə çarpır ki, söz cəm şəklikdə işlənib, amma məqsəd bir nəfərdir.

## Başqa cavab

Bizim alimlərdən bir qrupu və əhli-sünnə alimlərinin bəzisi bu iradın cavabında belə deyiblər:

Belə məqamlarda Allah-taala möminlərin əmiri İmam Əlinin (ə) bu fəzilət və üstünlüyünü böyük göstərmək istəyir. Buna görə də bir nəfər haqqında cəm şəklində danışır ki, Əlini (ə) və onun etdiyi işi böyük göstərsin. Necə ki, bir nəfəri hörmətlə yad etmək üçün bəzən cəm söz işlənir.

## Əllamə Seyid Əbdülhüseyn Şərəfüddinin (rə) nəzəri

Əllamə Seyid Əbdülhüseyn Şərəfüddinin (rə) bu barədə başqa nəzəri var. O yazır:

> *Əgər bu ayə tək şəkildə gəlsəydi, münafiqlər və Əmirəl-möminin İmam Əlinin (ə) düşmənləri Quranda əl gəzdirməyə çalışardılar və o həzrətlə düşmənçiliklərinə görə Quranı təhrif edərdilər. Çünki başqa bir çox ayələrdə də məqsəd yalnız həzrət Əli (ə) olduğu halda ayə cəm şəkildə işlənmişdir. Əgər bütün bu yerlərdə ayə tək şəkildə işlənsəydi, onlar Qurani-kərimdə düzəliş etmək fikrinə düşəcəkdilər.*
>
> *Belə olan hallarda məsələni kinayə ilə və cəm şəkildə bəyan etmək, tək şəkildə işlətməkdən daha cəlbedici və anlaşılandır. Quran xülasə şəkildə bəyan edir: Namaz halında sədəqə verən şəxslər sizin haminizdirlər. Bu zaman mövcud rəvayətlər müəyyən edirlər ki, o şəxs Əli b. Əbu-Talibdir (ə). Belə bəyan daha cəlbedicidir. Çünki müəyyən bir şəxsin adı çəkilməyib. Məşhur sözlə desək: Kinayə aşkar deməkdən daha cəlbedicidir.*[28]

## İmam Sadiqdən (ə) bir rəvayət

Bu barədə İmam Sadiqdən (ə) Əllamə Seyid Şərəfüddinin (rə) nəzərini dəstəkləyən mötəbər bir rəvayət nəql edilib.

Ravi İmam Sadiqdən (ə) soruşdu: -Niyə İmam Əlinin (ə) adı mənim aşkar dediyim kimi Quranda qeyd olunmayıb?

İmam Sadiq (ə) həmin şəxsin cavabında buyurur: -Əgər o həzrətin adı Quranda açıq-aşkar gəlsəydi, münafiqlər onun adını silərdilər. Beləcə

[28] «əl-Muraciat», 263.

Quranın təhrifi üçün əllər açılardı. Halbuki Allah-taala Quranı hər növ müdaxilə və dəyişiklikdən qorumaq istəyib. Belə ki, Allah-təala buyurur:

«إنّا له لحافظون»

*«Biz də onu (hər cür təhrif və təbdildən; artırıb-əskiltmədən) qoruyub saxlayacağıq!»*

## Bəyənilən bir cavab

Nəzərə çarpır ki, mövcud olan ən yaxşı cavab budur ki, belə deyək:

Quran, hədis və ərəb fəsihləri arasında bu cür işlədilən olduqca çox nümunələr var. Digər tərəfdən isə səhih və mötəbər rəvayətlərin hamısında gəlib ki, bu ayə yalnız İmam Əlinin (ə) haqqında nazil olmuşdur.

Amma niyə tək yerinə cəm sözünün işlənib sualının cavabını Zəməxşəri bir cür, Təbərsi bir başqa cür və Seyid Şərəfüddin bir başqa formada bəyan etmişlər.

Əgər Əllamə Əmininin (ə) çox dəyərli «əl-Ğədir» kitabına baxsanız, görərsiniz ki, bu dahi alim çoxlu ayələr qeyd edir ki, onlarda cəm sözü işlənib, amma onlardan məqsəd bir nəfərdir. O, oradakı bütün ayələri rəvayətlər və qəbul edilən və etimad olunan mənbələrə istinad edərək bəyan etmişdir.

Buna əsasən, heç bir təəccüblü məqam yoxdur ki, ayə cəm sözü ilə gəlsin, amma onun məqsədi bir nəfər olsun.

## Son söz

Şükr olsun Allaha ki, «Vilayət» ayəsinin nazil olma səbəbi və onu dəlil gətirməyin necəliyini müxtəsər şəkildə bəyan etdik. Bu arada bu mübarək ayə haqqında edilən ən mühüm etiraz və iradlara cavab verdik.

Daha öncə də bəyan etdiyimiz kimi sənəd və mənbələrdə Ğədir hədisi, Vilayət hədisi və s. bu kimi başqa rəvayətlər də var ki, möminlərin əmiri İmam Əlinin (ə) imamlığını sübut edir və bizim bu ayəni dəlil gətirməyimizi dəstəkləyir.

Əlbəttə, heç bir haqqı axtaran və insaf yolundan azmayan azad düşüncəli insanın, şiələrin bu ayəni dəlil olaraq istifadə etməsinin səhih və qəbul olunan olmasında tərəddüd edəcəyini və möminlərin əmiri İmam Əlinin (ə) imamətində şəkk edib heyran qalacağını düşünmürük. Çünki bu ayə o həzrətin imamətinin isbatının və möminlər üzərində daha layiq rəhbər olmasının dəlillərindən biridir. Allah və Məhəmməd peyğəmbərə (s) sabit olan üstünlük İmam Əli (ə) üçün də sabitdir. Buna əsasən, Allahın peyğəmbərinin (ə) möminlər üzərində vilayəti olduğu kimi İmam Əli (ə) də möminlərin hamisi və ixtiyar sahibidir.

Məlum məsələdir ki, belə bir üstünlük və fəzilət möminlərin əmiri İmam Əlidən (ə) başqası üçün sübuta yetməyib. Biz özümüzün bütün araşdırmalarımızda təkid etmişik ki, vilayət məsələsi möminlərin əmiri İmam Əli (ə) ilə Əbubəkr arasında dövr etsə, Həzrət Əliyə (ə) məxsus elə üstünlük və fəzilətlər var ki, Əbubəkrin heç zaman belə bir üstünlük və fəziləti olmayıb. Buna əsasən, imamət və vilayət üçün yalnız Həzrət Əli (ə) təyin edilməlidir.

## İstifadə edilmiş ədəbiyyat

1. Qurani-kərim

2. «İhqaq əl-həqq», Qazi Nurullah Mərəşi əş-Şüştəri, Kitabfuruşiye-İslami nəşriyyatı, Tehran, İran.

3. «Əsbab ən-nuzul», Əli bin Əhməd əl-Vahidi ən-Nişaburi, Əlam əl-Kutub, Beyrut, Livan.

4. «Tarix Diməşq əl-kəbir», İbn Əsakir, Dar əl-Fikr, Beyrut, Livan, h.q. 1421.

5. «Təfsir İbn Əbu Hatim» (Təfir əl-Quran əl-Əzim), İmam Əbd ər-Rəhman bin Muhəmməd bin İdris ər-Razi bin Əbu Hatim, Məktəbə Nəzzar Mustafa əl-Bazz, Məkkə, Səudiyyə Ərəbistanı, ikinci çap, h.q. 1419.

6. «Təfsir İbn Kəsir», İbn Kəsir əd-Diməşqi, Dar əl-Mərifə, Beyrut, Livan, üçüncü çap, h.q. 1409.

7. «Təfsir Əbu əs-Səud», Qazi əl-quzat İmam Əbu əs-Səud, Dar İhya ət-Turas əl-Ərəbi, Beyrut, Livan.

8. «Təfsir əl-İzz əd-Dəməşqi», İzz əd-Din əd-Diməşqi əş-Şafei, Dar İbn Həzm, Beyrut, Livan, birinci çap, h.q. 1416.

9. «Təfsir əl-Bəğəvi (Məalim ət-tənzil fi ət-təfsir və ət-təvil), Əbu Muhəmməd əl-Hüseyn bin Məsud əl-Fərra əl-Bəğəvi, Dar əl-Fikr, Beyrut, Livan, h.q. 1405.

10. «Təfsir Sələbi», (əl-Kəşf və əl-bəyan), Əhməd bin Muhəmməd əs-Sələbi, Dar İhya ət-Turas əl-Ərəbi, Beyrut, Livan, birinci çap, h.q. 1422.

11. «Ruh əl-məani», Şəhab əd-Din Seyid Mahmud əl-Alusi, Dar İhya ət-Turas əl-Ərəbi, Beyrut, Livan, dördüncü çap, h.q. 1405.

12. «Təfsir əş-Şəvkani» (Fəth əl-qədir), Muhəmməd bin Əli bin Muhəmməd əş-Şəvkani, Dar əl-Mərifə, Beyrut, Livan.

13. «Təfsir ət-Təbəri», (Cami əl-bəyan fi təfsir əl-Quran), Muhəmməd bin Cərir ət-Təbəri, Dar əl-Mərifə, Beyrut, Livan, h.q. 1412.

14. «Təfsir Fəxr ər-Razi» (Məfatih əl-ğəyb), Fəxr ər-Razi, Dar İhya ət-Turas əl-Ərəbi, Beyrut, Livan, üçüncü çap.

15. «Təfsir əl-Qurtubi», (əl-Cami li-əhkam əl-Quran), Məhəmməd bin Əhməd əl-Ənsari əl-Qurtubi, Dar İhya ət-Turas əl-Ərəbi, Beyrut, Livan, ikinci çapın ofseti.

16. «Təfsir ən-Nəsəfi», (Mədarik ət-tənzil), Abdullah bin Əhməd bin Mahmud ən-Nəsəfi, Dar əl-Mərifə, Beyrut, Livan.

17. «Cami əl-usul», İbn Kəsir əd-Diməşqi, Dar əl-Fikr, Beyrut, Livan, birinci çap, h.q. 1421.

18. «əd-Dur əl-mənsur fi ət-təfsir bi əl-məsur», Cəlal əd-Din əs-Suyuti, Dar əl-Kutub əl-İlmiyyə, Beyrut, Livan, birinci çap, h.q. 1421.

19. «Şərh ət-təcrid», əl-Quşci, 1307.

20. «Şərh əl-məqasid», Səad əd-Din ət-Təftazani, Şərif ər-Rəzi nəşriyyatı, Qum, birinci çap, h.q. 1409.

21. «Şərh əl-məvaqif», Seyid əş-Şərif əl-Curcani, Şərif Rəzi nəşriyyatı, Qum, birinci çap, h.q. 1412.

22. «Əl-Kəşşaf», Mahmud bin Ömər əz-Zəməxşəri, Dar əl-Kutub əl-İlmiyyə, Beyrut, Livan, birinci çap, h.q. 1415.

23. «Kəşf əz-zunun», Hacı Xəlifə, Dar İhya ət-Turas əl-Ərəbi və Dar əl-Fikr, Beyrut, Livan, h.q. 1414.

24. «Əl-Muraciat», Seyid Əbd əl-Hüseyn Şərəf əd-Din, ikinci çap, h.q. 1402.

25. «Əl-Mucəm əl-əusət», Süleyman bin Əhməd ət-Təbərani, Dar əl-Hərəmeyn, h.q. 1415.

26. «Minhac əs-sunnə ən-nəbəviyyə», İbn Teymiyyə, Mətbəə İbn Teymiyyə, Misir, ikinci çap, h.q. 1409.

27. «Əl-Məvaqif fi ilm əl-kəlam», Qazi Əbd ər-Rəhman bin Əhməd əl-İyci, Əlam əl-Kutub, Beyrut, Livan.